**UOT 619:577.27**

# LƏNKƏRAN TƏBİİ İQTİSADİ COĞRAFİ İQLİM ZONASINDA İNƏKLƏR ARASINDA DOĞUMDAN SONRAKI XƏSTƏLİKLƏRİN YAYILMA SƏVİYYƏSİ

**Q.M MURTUZOV**
**AKTN Baytarlıq Elmi Tədqiqat İnstitutu**

*Heyvandarlığın intensiv inkişafına, hər inəkdən bala alınmasına, yüksək məhsul əldə olunmasına mane olan xəstəliklərdən öndə gedənləri doğumdan sonra yaranan xəstəliklərdir. Bu xəstəliklər heyvandarlıqda məhsuldarlığı və sağlam bala alınmasını kəskin şəkildə azaldır, məhsulun kəmiyyət və keyfiyyətini aşağı salır. Bunun üçün də qarşıya qoyulan məqsəd Respublikaya gətirilmiş cins inəklər arasında doğumdan sonra yaranan xəstəliklərin baş vermə səbəbləri, yayılma səviyyəsi və bu xəstəliklərə qarşı müalicə-profilaktika tədbirlərinin işlənib hazırlanmas olub.*

***Açar sözlər:*** *inək, cins, metrit, mastit, sonun ləngiməsi, doğum parezi*

Heyvandarlığın intensiv inkişafına, yüksək və keyfiyyətli məhsulun əldə olunmasına mane olan səbəblərdən biri də doğumdan sonra yaranan xəstəliklərdir. Heyvanların bu xəstəliklərə tutulması bir çox səbəblərdən ola bilər. Bunlara – xəstəlik törədiciləri, heyvanların saxlama-bəslənmə şəraiti, məhsuldarlığı, cinsi, yaşı, doğulan balanın çəkisi, boğazlıq müddəti və s. aiddir. Bu xəstəliklər zamanı təsərrüfatlara böyük iqtisadi zərər dəyir. Təsərrüfat sahibi hər inəkdən ildə bir bala və 300 gün inəyin sağalmasını qarşıya məqsəd qoymalıdır. Əks təqdirdə təsrrüfat rentabelli ola bilməz. Bütün bu sadalananlara mane olan səbəblərdən başda duranı doğumdan sonra yarana biləcək xəstəliklərdir. Bu xəstəliklərə metrit, mastit, sonun ləngiməsi, doğum parezi və s. aiddir. Bu xəstəliklərin müxtəlif formaları mövcuddur:

Metrit-balalığın iltihabı xəstəliyidir. Bu xəstəliyin də bir neçə növü var ki, bunlardan ən geniş yayılanı endometritdir. Endometrit balalığın səthi və dərin selik qişasının iltihabıdır. Metrit xəstəliyi vaxtında aşkarlanıb müalicə olunmadıqda heyvanların qısır qalmasına səbəb olur.

Mastit- süd vəziləri toxumasının iltihabi prosesidir. Mastitlərin xarakterindən və etioloji amillərdən asılı olaraq bir çox növləri mövcuddur. Lakin bu növlər arasında Respublikada ən geniş yayılanı subklinik mastitdir. Bu xəstəlik zamanı süd vəziləri öz funksiyasını qismən, müalicə edilmədikdə isə tamamilə itirir. Bu dövrdə sağılan süd keyfiyyətsiz süd olduğu üçün istifadəyə yararsız sayılır, hətta bu südün körpə heyvanlara verilməsi onlarda bir çox xəstəliklərin yaranmasına səbəb olur.

Heyvanlarda doğum prosesi sonun orqanizmdən tam ayrılması ilə sona çatır. Bu proses müxtəlif heyvanlarda müxtəlif vaxtlarda başa çatır. İnəklərdə bu prosesin 10-12 saatdan çox çəkməsi sonun ləngiməsi ilə nəticələnir. Bu xəstəlik bütün növ heyvanlarda, lakin ən çox inəklərdə müşahidə olunur. Sonun ləngiməsi tam və natamam formada ola bilər. Əgər son vaxtında ayrılmaz və lazimi tədbirlər görülməzsə bu xəstəlik sonda endometritin yaranmasına səbəb olur ki, vaxtinda müalicə edilmədikdə inəyin qısır qalması ilə nəticələnir.

Doğum parezi-heyvanların iti, ağır-sinir xəstəliyi olub, huşun itirilməsi, dilin, udlağın, bağırsaq və ətrafların iflici ilə səciyyələnir. Bu xəstəlik zamanı heyvan ayağa qalxa bilmir, yemdən imtina edir, vaxtında müalicə edilmədikdə müalicə kursu uzun çəkir, təsərrüfata böyük iqtisadi ziyan vurur.

Bütün deyilənləri nəzərə alaraq demək olar ki, bu xəstəliklərin ətraflı öyrənilməsi, xəstəliklərə qarşı profilaktik tədbirlərin görülməsi, vaxtında səmərəli müalicənin aparılması böyük əhəmiyyət kəsb edir. Bunun üçün Respublikasının bir çox zaonalarında, o cümlədən də Lənkəran coğrafi iqtisadi iqlim zonasında bu xəstəliklərin yayılma səviyyəsinin öyrənilməsi qarşıya məqsəd qoyulmuşdur.

Müasir dövrdə heyvandarlığın intensiv inkişafı üçün baytarlıq-sanitariya qaydalarına əməl edilməsi vacib məsələlərdən biridir. Əks təqdirdə heyvanlar arasında bir çox, o cümlədən doğumdan sonrakı xəstəliklərin baş verməsi qaçılmazdır.

**Material və metodlar:** Tədqiqat işləri, təcrübə və müşahidələr 2013-cü ildn Azərbaycan Baytarlıq Elmi-Tədqiqat İnstitutunun yoluxmayan xəstəliklər və baytarlıq-sanitariya şöbəsində, infeksion xəstəliklər şöbəsində, zona baytarlıq laboratoriyalarında, bu zonada yerləşən heyvandarlıq komplekslərində, fermer və şəxsi təsərrüfatlarda aparılmışdır. Tədqiqat və müşahidələr zamanı baytar həkimlərin və suni mayalanma texniklərinin qeydiyyat jurnallarından istifadə olunmuşdur.

Tədqiqat işləri apardığımız dövrdə təsərrüfatlarda olan inəklər müayinədən keçirilmiş, xəstə və xəstəliyə şübhəli heyvanlar qeydiyyata alınaraq müalicə kursları tətbiq edilmişdir.. Bu xəstəliklərin müayinəsi zamanı anamnez müəlumatlar, xəstəliyin kliniki əlamətləri, bakterioloji müayinələrin nəticələri nəzərə alınaraq xəstəliyə diaqnoz qoyulmuşdur.

Müayinələr aparılarkən məlum ədəbiyyat mənbələrindən, bundan əlavə tədqiqatlar zamanı məlum metodlardan da istifadə edilmişdir.

**Alınan nəticələr və onların təhlili:** Məsələlərin həlli ilə əlaqədar 2013-cü ildən Lənkaran zonasının üç rayonunda kəndli-fermer və fərdi təsərrüfatlarda tədqiqat və müşahidələr aparılmışdır. Müşahidə və tədqiqatlarla yanaşı bu rayonların baytar həkimlərinin, süni mayalanma texniklərinin qeydləri də araşdırılmışdır. Tədqiqat və müşahidələr 1710 baş cins və yerli inəklər üzərində aparılmışdır. Təsərrüfatlarda müxtəlif cins və yaş qruplarından olan inəklər saxlanılır.

Müayinələr zamanı 132 baş inəkdə endometrit, 121 baş inəkdə mastit, 71 baş inəkdə sonun ləngiməsi və 33 baş inəkdə doğum parezi müşahidə edilmişdir. Tədqiqat işləri Holştein friz, Qara-ala, Simmental, Svis cinsləri və yerli inəklər üzərində aparılmışdır.

Bu zonada saxlanılan inəklər arasında doğumdan sonra yaranan xəstəliklərin yayılma səviyyəsi cədvəl 1-də göstərilmişdir

Cədvəlin analizindən göründüyü kimi bu bölgədə müxtəlif cinsdən olan inəklər arasında doğumdan sonrakı xəstəliklər geniş yayılıb. Bu xəstəliklər arasında ən çox yayılanı metrit və mastit xəstəliyidir. Alınan nəticələr göstərir ki, müayinə olunan 1710 baş inəkdən 132 baş inəkdə metrit, 121 baş inəkdə mastit, 71 baş inəkdə sonun ləngiməsi, 33 baş inəkdə isə doğum parezi baş vermişdir. Qeyd olunduğ kimi müayinələr bu bölgənin təsərrüfatlarında saxlanılan müxtəlif cinsdən olan inəklərlə yanaşı yerli inəklər üzərində də aparılmışdır. Xəstəliklərin müəyyən edilməsində klinik əlamətlərdən, anamnez məlumatlardan, bakterioloji müayinə üsullarından istifadə edilmişdir. Xəstəliklərin baş verməsində heyvanların saxlanma-bəslənmə şəraiti, heyvanların cinsi, təsərrüfatların yerləşdiyi iqlim zonası, heyvanların məhsuldarlığı, doğum qabağı heyvanların bəslənməsi və s.amillər böyük rol oynayır. Bu xəstəliklərin baş verməsində əsas səbəblərdən biri də xəstəlik törədiciləri olan mikroorqanizmlərdir. Sadalanan amillərlə yanaşı xəstəliklərin baş verməsində stress amilləri və xarici müdaxilələr-doğum zamanı düzgün göstərilməyən yardımlar, sonun ləngiməsi, süni mayalanma, sağım zamanı gigiyenik qaydalara əməl olunmaması, heyvanların düzgün bayatlıq-sanitariya qaydalarına uyğun saxlanılmaması, vaxtlı-vaxtında gəzintinin verilməməsi və s. xəstəliklərin baş verməsinə səbəb olur. Heyvanların düzgün saxlanıb-bəslənilməməsi orqanizmdə vitamin-mineral çatışmazlığına, maddələr mübadiləsinin pozulmasına səbəb olur ki, nəticədə bir çox xəstəliklər o cümlədən doğumdan sonrakı xəstəliklər baş verir.

Tədqiqatlar zamanı qarşıya qoyulan digər bir məsələ Lənkaran zonasında müxtəlif cinsdən olan inəklər arasında bu xəstəliklərin yayılma səviyyəsini öyrənmək olub. Tədqiqatlar zamanı bu bölgədə olan dörd cinslə yanaşı yerli inəklərin də bu xəstəliklərin yoluxması müqayisəli şəkildə öyrənilib və cədvəl 2-də verilib.

**Cədvəl 1**

**Lənkaran təbii iqtisadi coğrafi bölgəsində inəklər arasında doğumdan sonra yaranan xəstəliklərin yayılma səviyyəsi**

| Təsərrüfatların adları | Müayinə olunan inəklərin sayı (baş) | Metrit | | Mastit | | Sonun ləngiməsi | | Doğum parezi | |
|---|---|---|---|---|---|---|---|---|---|
| | | xəstə inəklərin sayı | % | xəstə inəklərin sayı | % | xəstə inəklərin sayı | % | xəstə inəklərin sayı | % |
| Cəlillabad | | | | | | | | | |
| "Uzun təpə" fermer təsərrüfatı | 153 | 21 | 7,84 | 10 | 6,53 | 8 | 5,22 | 3 | 1,96 |
| "Göy təpə" fermer təsərrüfatı | 194 | 17 | 8,76 | 15 | 7,73 | 10 | 5,15 | 5 | 2,57 |
| Fərdi təsərrüfat | 129 | 10 | 7,75 | 9 | 6,97 | 6 | 4,65 | 1 | 0,43 |
| Masallı | | | | | | | | | |
| "Balatəkə" fermer təsərrüfatı | 117 | 11 | 9,4 | 10 | 8,54 | 6 | 5,13 | 3 | 2,56 |
| Ərkivan fermer təsərrüfatı | 140 | 10 | 7,14 | 11 | 7,86 | 5 | 3,57 | 2 | 1,43 |
| Binoxosoval fermer təsərrüfatı | 134 | 12 | 8,95 | 12 | 8,95 | 5 | 3,73 | 3 | 2,24 |
| Fərdi təsərrüfat | 133 | 9 | 6,77 | 8 | 6,0 | 4 | 3,0 | 2 | 1,5 |
| Lənkaran | | | | | | | | | |
| "Ləvəngi" fermer təsərrüfatı | 95 | 8 | 8,42 | 7 | 7,36 | 5 | 5,26 | 2 | 2,10 |
| "Yaşıl çay fermer təsərrüfatı" | 150 | 11 | 7,33 | 10 | 6,67 | 7 | 4,66 | 4 | 2,66 |
| "Göy şaban fermer təsərrüfatı" | 120 | 9 | 7,5 | 8 | 6,66 | 5 | 4,16 | 3 | 2,5 |
| "Fəxrəddin" fermer təsərrüfatı | 135 | 10 | 7,4 | 10 | 7,4 | 6 | 4,44 | 3 | 2,22 |
| Fərdi təsərrüfat | 210 | 13 | 6,19 | 11 | 5,23 | 4 | 1,9 | 2 | 0,95 |

**Cədvəl 2**

**Lənkaran təbii-iqtisadi coğrafi bölgəsində müxtəlif cinsdən olan inəklərin doğumdan sonra yaranan xəstəliklərə yoluxma həssaslığı**

| Rayonların adları | İnəklərin cinsləri | | | | | | | | | | | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | Holştein friz | | | | Qara-ala | | | | Simmental | | | | Svis | | | | Yerli | | | |
| | Metrit (%) | Mastit (%) | sonun ləngiməsi (%) | doğum parezi (%) | Metrit (%) | Mastit (%) | sonun ləngiməsi (%) | doğum parezi (%) | Metrit (%) | Mastit (%) | sonun ləngiməsi (%) | doğum parezi (%) | Metrit (%) | Mastit (%) | sonun ləngiməsi (%) | doğum parezi (%) | Metrit (%) | Mastit (%) | sonun ləngiməsi (%) | doğum parezi (%) |
| Cəlilabad | 11,05 | 9,93 | 6,22 | 2,57 | 10,1 | 9,2 | 5,25 | 2,1 | 9,85 | 6,23 | 4,1 | 3,0 | 8,1 | 5,95 | 3,5 | 2,3 | 2,5 | 2,3 | 1,9 | 1,2 |
| Masallı | 10,89 | 9,1 | 5,97 | 2,58 | 8,1 | 6,80 | 5,32 | 2,0 | 9,52 | 5,98 | 3,85 | 2,96 | 7,65 | 5,36 | 3,2 | 1,9 | 2,83 | 1,98 | 2,0 | 1,5 |
| Lənkaran | 12,03 | 9,33 | 6,13 | 2,93 | 9,98 | 7,22 | 4,48 | 1,96 | 9,92 | 6,12 | 3,25 | 2,1 | 6,95 | 5,22 | 2,96 | 1,85 | 2,24 | 1,96 | 1,83 | 1,1 |

Cədvəlin təhlilindən görünür ki, Lənkaran təbii-iqtisadi iqlim zonasında dörd cins və yerli inəklər üzərində aparılan tədqiqatların nəticələrinə əsasən bu xəstəliklərə Respublikaya gətirilmiş cins inəklər daha həssasdır. Doğumdan sonrakı xəstəliklərə ən həssas cins Holştein friz cinsidir ki, bu cinsdən olan inəklərdə metritə yoluxma faizi (10,89-12,03%), mastitə yoluxma (9,1-9,93%), sonun ləngiməsi (5,97-6,22%), doğum parezi (2,57-2,93%) təşkil edir. Qara-ala cinsdən olan inəklərdə metritə yoluxma (8,1-10,1%), mastitə yoluxma (6,80-9,2%), sonun ləngiməsi (4,48-5,32%), doğum parezi (1,96-2,1%) təşkil edir. Simmental cinsində bu göstəricilər müvafiq olaraq metritdə (9,52-9,92%), mastitdə (5,98-6,23%), sonun ləngiməsində (3,25-4,1%), doğum parezində (2,1-3,0%) təşkil edir. Svis cinsində yoluxma faizi metritlə (6, 95-8,1%), mastitlə (5,22-5,95%), sonun ləngiməsi (2,96-3,5%), doğum parezi (1,85-2,3%) olmuşdur.Yerli inəklərdə bu göstəricilər metritdə (2,24.-2,83 %), mastitdə (1,96-2,3%), sonun ləngiməsində (1,83-2,0%), doğum parezində isə (1,1-1,5%) təşkil etmişdir.

Cins inəklərin bu xəstəliklərə daha həssas olmaları onların zəif konstitusiya quruluşuna malik olmaları, yüksək məhsuldarlığı, yerli şəraitə, iqlimə, bəslənmə-saxlanma şəraitinə çətin uyğunlaşması, doğulan buzovların böyük olması və s. amillərlə izah olunur.

Yerli inəklər əksinə olaraq iqlimə və bəslənmə-saxlanma şəraitinə uyğunlaşıblar, məhsuldarlıqları böyük deyil, doğulan balalar da nisbətən kiçik olduğu üçün bu kumi xəstəliklərə az yoluxurlar.

Qeyd etmək lazımdır ki, bu xəstəliklərə qarşı mübarizə və profilaktika tədbirlərinin hazırlanması cox vacibdir, bu tədbirlər hazırlanarkən heyvanların cinsi, çəkisi, məhsuldarlığı, bəslənmə-saxlanma şəraiti, iqlim və s. amillər mütləq nəzərə alınmalıdır.

**Nəticə**

Tədqiqat və müşahidələri təhlil edərək aşağıdakı nəticələrə gəlmək olar:

1. Lənkaran təbii iqtisadi coğrafi iqlim zonasında cins və yerli inəklər arasında doğumdan sonrakı xəstəliklərin yayılma səviyyəsi1,85-12,03 % təşkil edir.
2. Bu zonada saxlanılan Holştein friz və Qara-ala cinsdən olan inəklər başqa cins inəklərə nisbətən bu xəstəliklərə daha həssasdır.
3. Heyvanların cins tərkibindən asılı olaraq bu xəstəliklərə həssaslığı da dəyişir. Belə ki, Holştein friz cinsi xəstəliklərə həssas olduğu halda yerli inəklər xəstəliklərə davamlıdır.
4. Bu xəstəliklərə qarşı müalicə-profilaktika tədbirləri aparılarkən heyvanların cins tərkibi, məhsuldarlığı, konstitusiyası, saxlanma-bəslənmə şəraiti və s. amillər nəzərə alınmalıdır.

**ƏDƏBİYYAT**

1.Rzayev Ç.A., Seyidov M.İ. Baytarlıq mamalığı, ginekologiyası və kənd təsərrüfatı heyvanlarının suni mayalandırılması. Bakı, 1975, 212 s. 2. Prof.dr Hazım Gökçen Südçü ineklerde doğum sonu görülen hastalıklar. Ankara, 2016, s.23-32. 3.Məmmədli Ə.T. İnəklərin yelin xəstəlikləri, Bakı, 2011, 58 s. 4.Белоборденко М.А. Причины бесплодия у коров // сборник научных трудов,Тюмен, 2002, с.26-27. 5. Белоборденко М.А О воспроизводстве крупно-рогатого скота в условиях гиподинамии // Аграрный вестник Урала, 2011,.№8, с. 31-32. 6. Гудыменко В.И Молочная продуктивность и воспроизводительные качества голщтинизированного черно-пестрого скота // Известия Оренбургского государственного аграрного университета 2015, т.53. №3,с.129-131. 7. Сысоев А.А Физиология размножения сельскохозяйственных животных М:Колос, 1978, 360 с. 8. Ивашкевич О.П. Диагностика беременности у коров// Ветеринария и кормление, 2005, №1.с.16-17. 9. Roszel J.F. Eguine endometrial cytology Vet.North.Am.-1988.-V4.-№2.-P.247-264.

**Послеродовые осложнения у коров различных пород в Ленкеранской климатической зоне Азербайджана**

**Г.М.Муртузов**

Интенсификация животноводства непосредственно связана с получениям приплода и увеличением продуктивности скота. Однако, для достижения вышесказанного основой которых является предупреждения маточного поголовья от послеродовых осложнений, которые приводят с снижению приплода, молочной продуктивности и его качества.

Исходя из этого основой задачи наших исследований является установление причин и распространения послеродовых заболевании среди завозного и местного скота, и на основе этого разработать лечебно-профилактические мероприятия по устранению данных заболеваний.

***Ключевые слова:*** *после отела, корова, метрит, мастит, задержка последа, родильный парез, порода.*

**The potassium complications of the cows of various rocks in the Lenkeran climate zone of Azerbaijan**

**Q.M.Murtuzov**

Intensification of animal husbandry is directly related to the receiving of an offspring and an increase in the productivity of livestock. However, to achieve the above, the basis of these is the prevention of the breeding stock from postpartum complications, which lead to reduced litter, milk productivity and its quality.

Based on this, the main task of our research is to establish the causes and distribution of postpartum disease among imported and local livestock, and on the basis of this, to develop therapeutic and preventive measures to eliminate these diseases.

***Key words****: after calving, cow, metritis, mastitis, delayed afterbirth, maternity paresis, breed.*

